UOT: 634.11:631

# NAXÇIVAN MUXTAR RESPUBLİKASINDA MEYVƏ GENOFONDUNUN SORT TƏRKİBİ

**V.M. QULİYEV**
**Azərbaycan MEA Naxçıvan Bölməsi Bioresurslar İnstitutu**

*Məqalədə Naxçıvan Muxtar Respublikasında yayılan meyvə genofondunun sort tərkibi verilmiş, ərazidə becərilən tumlu, çəyirdəkli, qoz meyvələrin sort müxtəlifliyi araşdırılmışdır. Həmçinin, məqalədə tətbiqyönümlü, iqtisadi əhəmiyyətli sortlar müəyyənləşdirilmiş, Naxçıvan MR ərazisinin landşaftı xüsusiyyəti üzrə meyvə sortlarının əsas təbii yayıldığı hündürlük qurşaqları haqqında məlumatlar verilmişdir.*

***Açar sözlər:*** *meyvəçilik, tumlu meyvələr, çəyirdəkli meyvələr, qoz meyvələr, landşaft, sort.*

Müasir dövrdə Azərbaycan Respublikasında, o cümlədən Naxçıvan Muxtar Respublikasında meyvəçiliyin genişləndirilməsinə Dövlət qayğısı ildən-ilə artmaqdadır. Buna müvafiq olaraq Naxçıvan Muxtar Respublikasında da meyvəçiliyin genişləndirilməsi istiqamətində 2012-2015 və 2016-2020-ci illəri əhatə edən iki "Dövlət Proqramı" qəbul edilmişdir. Naxçıvan Muxtar Respublikası Ali Məclisinin 8 fevral 2016-cı ildə təsdiq etdiyi "2016-2020-ci illərdə Naxçıvan Muxtar Respublikasında meyvəçiliyin və tərəvəzçiliyin inkişafı üzrə Dövlət Proqramı" həyata keçirilməkdədir. Muxtar respublikada əhalinin meyvə, tərəvəz və üzüm məhsulları ilə dolğun təmin olunması, xaricə ixrac edilməsi, nəticədə kənd əhalisinin məşğulluğunun artırılması və maddi-rifah halının yüksəldilməsi "Dövlət Proqramı"nın əsas istiqamətini təşkil edir. Regionda meyvəçilik əhalinin əsas məşğulluq sahələrindəndir. Regionda torpaq-iqlim şəraiti müxtəlif giləmeyvə, meyvə ağaclarının tez böyüməsi, inkişafı, bol və yüksək keyfiyyətli məhsul verməsi üçün olduqca əlverişlidir. Son dövrlər muxtar respublikada həyata keçirilən irimiqyaslı islahatlar, kənd təsərrüfatının inkişaf etdirilməsinə dair qəbul edilən qərarlar, reallaşan Dövlət Proqramları kənd təsərrüfatı məhsullarının, o cümlədən meyvə məhsullarının istehsalının sənaye miqyasında inkişaf etdirilməsinin təməlini qoymuşdur. 2020-ci illədək müxtar respublikada meyvə istehsalı həcminin 62 min tona, üzüm istehsalının isə 30 min tona çatdırılması planlaşdırılmışdır [1, 2, 3, 4].

Azərbaycanda elmi ədəbiyyatlarda tədqiqatçılardan Ə.C.Rəcəbli, T.M.Tağıyev əsərlərində yerli meyvə sortları haqqında geniş məlumat vermişdir. Müasir dövrdə inkişaf etmiş dünya dövlətlərində olduğu kimi muxtar respublikanın da aqrar siyasətində kənd təsərrüfatında becərilən meyvə və giləmeyvə bitkilərinin genofondunun toplanılması, sort tərkibinin qorunması, seleksiya yolu ilə zənginləşdirilməsi, rentabelli sortlar əsasında əkin sahələrinin genişləndirilməsi, istehsalının təşkili və onlardan yüksək iqtisadı səmərə əldə edilməsi mühüm elmi-praktiki əhəmiyyət kəsb edir [5, 6, 7, 8, 9].

## Eksperimental hissə

Muxtar respublikada meyvə genofondunun öyrənilməsi, sort tərkibinin müəyyənləşdirilməsi, tətbiqyönümlü sortların seçilməsi və iqtisadi qiymətləndirilməsi məqsədilə, xüsusilə alma, gilas və gilənarın, həmçinin alçanın və Naxçıvan göycəsi sortlarının öyrənilməsi istiqamətində mühüm elmi-tədqiqat işləri aparılmışdır[ ].

Muvtar respublika ərazisində aşağıdakı meyvə bitkiləri geniş yayılmışdır:

***-Tumlu meyvələr:***Alma, Armud, Heyva, Əncir, Əzgil, Nar,Yemişan,

***-Çəyirdəkli meyvələr:*** Albalı, Gilas, Şaftalı, Ərik, Alça, Zoğal.

***-Qoz meyvələr*:** Qoz, Badam, Fındıq, Püstə, Pekan.

## Tumlu meyvələr

### Alma (*Malus* Mill.)

Alma gülçiçəklikimilər (*Rosaceae* Adans.) fəsiləsinə *Pomideae* yarımfəsiləsinə mənsub olan *Malus* Mill. cinsinə aiddir. Dünyada almanın 20 minə qədər sortu vardır ki, bunun da 325-dən çoxu MDB-nin meyvəçilik bölgələri üçün rayonlaşdırılmışdır. Bu sortların hamısı mədəni alma (*Malus domestica* Borkh.) növünə daxildir. Bura Şərq və ya Qafqaz alması (*M. Oreantalis* Uglitiz) da daxildir. Müxtar respublika ərazisində 110-dan çox alma sort və formaları yayılmışdır. Hazırda müxtəlif eko-coğrafi ərazilərdə iqtisadi səmərəliliyi müəyyənləşdirilir. Ərazidə yayılan *Malus* Mill. cinsinin genofondu aşağıda verilmişdir:

***Alma sortlarının genofondu:*** Rəcəbi, Sultanı, Ağ alma, Darağı, Daş alma, Əkbəri, Seyid Şükri, Stəkanvari alma, Tabaq alma, Əyyubi, Toz alma, Şax alma, Zolaqlı alma, Xumar alma və s.

Naxçıvanın aborigen sortları və 50-60 il bundan öncə gətirilmiş Borovinka, Popirovka, Sarı Belflor,

Rozmarin, Qırmızı Belflor, Antonobka, Qış qızılı, Qrafenşteyn, Aport, Qəndil sinab, Qışlıq banan, Sarı sinab sortları ilə yanaşı yeni introduksiya olunmuş Ağ Marağan, Qırmızı Marağan, Urmiya (İran İslam Respublikasından), İzmir-6 forması (Türkiyə Respublikasından gətirilib), Cır Hacı, Qızıl Əhmədi, Sarı turş, Sosikoli reneti, Palmet, Melba, Napoleon, VaqneraPrizavoy, Şampan reneti, Sini alma, Yay alması, Qırmızı müşkü, Rəşad alması, Ordubad gözəli, Məzrə, Girdə qırmızı, Loğazbəyi, Darağı, Kol alması, Düsən alması, Ağ alma, Şəkər alma, Şafran, Azərbaycan, Fatimə, Babək, Cənnət alması və s. Bunlardan.***Yaylıq sortlar:*** Yaylıq alma, Şada alması, Ordubad gözəli, Qırmızı müşki, Qirbi-şirin, Kəpək alma, Pambığı, Dolma alma, Rəcəbi, Fəximə, Ağ alma, Papirovka, Borovinka, Qırmızı Qrafşteyin, Rəşad alma, Şirvan müşki, Şəkəri, Gəm alma, Məclisi, Zeynəddin-1, Şıxmahmud-3, Güney Qışlaq -6 və s. ***Payızlıq sortlar:*** Payız alması (Narıncı), Zolaqlı alma, Stəkan alma, Girdə qırmızı, Cənnət alma, Heyva alma, Qızıl parmen, Şirvan tacı, Antonovka, Anis, Aport, Sarı belflor, Qırmızı belflor, Gəlin alma, Hacı Hüseyin, Vahab alma, Soba alma, Maruq alma, Şax alma, Gənzə alma, Gülaman alma, Sarı sinab, Qəndil sinab, Mekintoş, Muxəstə alması (Güney Qışlaq-1), Milax -2, Unus-1, Kükü-3, Payız-6 və s. ***Qışlıq sortlar:*** Qırmızı tabaq alma, Cır Hacı, Qış Qızılı, Ağ rozmarin, Banan sortu, Zolaqlı anis, Adi antonovka, Kağız reneti (Toz alma), Loğazbəyi, Məzrə, Daş alma, Təkər alma, Darağı, Sarı turş, Sultanı, Pərvin, İl görən, Top qırmızı, Cöy alma, Əkbəri, Abı cəhət, Qızıl Əhmədi, Cibir, Şıxıcanı, Əyyubi, Marağan qırmızı, Marağan ağ, Düsen alması, Mehdi cırı, Seyid Şüküri, Boyken, Babək, London pepini, Kanada reneti, Külüs alması, Şahbuz alması, Keçili alması.

**Tətbiqyönümlü alma sortları.** ***Yaylıq sortlar:*** Ağ alma, Boravinka, Gəm alma, Qırmızı Qrafşteyn, Qırmızı müski, Ordubad gözəli, Papirovka, Rəşad alma, Şirvan reneti, Yay alması, ***Payızlıq sortlar:*** Girdə qırmızı, Heyvadadl alma, Qəndil-sinab, Landsberq reneti, Ordubadi, Mekintoş, Məzrə alması, Sarı Berflor, Şax alma, Turş alma, Zolaqlı alma. ***Qışlıq sortlar*****:** Daş alma, Darağı, Əkbəri, Əyyubi, Gəlin alma, Hacı Hüseyin, Xumar alması, Kələmpur, Qızıl Əhmədi. Qırmızı Cibir, Qırmızı marağan, İran alması, Ağ rozmarin, Qış Qızılı, Loğazbəyi, Sarı sinab, Seyid Şüküri, Sultanı, Şampan reneti, Şəkəri alma, Tabaq alma, Topvari qırmızı alma, Vahab alma.

Armud bitkisi *Rosaceae* Juss. (Gülçiçəklikimilər) fəsiləsinin *Pomoideae* (Alma) yarımfəsiləsinin *Pyrus* L. cinsinə aiddir. Dünya florasında armud cinsinin 60-a qədər növü məlumdur. Bu növlərdən yüzlərlə mədəniləşdirilmiş sort və formalar yetişdirilmişdir. Azərbaycanda, o cümlədən Naxçıvan MR-də bir çox yerli sortlar Böyük və Kiçik Qafqaz dağlarının meşələrində bitən *Pyrus caucasica* Fel. növündən alınmışdır. Müxtar respublika ərazisində 30-dan çox armud sort və formaları müəyyənləşdirilmişdir.





**Şəkil1. Tabaq alma** **Ağ alma**





**Naxçıvan qırmızı alması** **Ağ qəndil sinab**

**Armud (***Pyrus* L.)

***Armud sortlarının genofondu:*** Naxçıvan yay armudu, Lətənzi, Şəkəri, Sarı şəkəri, Daş armud, Məleci, Sultanı, Sini armud, Dırnıs armudu, Nar armud, Şahbulaq armudu, Qum armud, Yendicə armudu, Xoyi, Abasbəyi, Cır nadiri, Yay armudu, Bozdoğan, Mehdi armudu, Nəbi, Cəlali, Bal armud, Daş armud, Şəkəri, Qızıl armud, Hacı Hüseyn, Hacı Mehri armudu, Hivili, Ordubad məléçəsi, Ordubad armudu, Yaşıl armud, Lətənzə, Ağ armud, Əndəmic armudu, Ordubadi, Sarı Rəcəbi, Dırnıs armudu, Peyğənbəri, Qırmızı şəkəri, Qırmızı məleçə,, Mixəyi, Qış armud, Alatəpə, Sultanı, Bildirçin budu, Göy armud, Alyanaq, Bal armud, Nar armud, Əndəmic və s.

***Introduksiya olunmuş armud sortlari:*** Ardanpon, Bere-Bosk, Sen-Jermen, Olivye de serr, Meşə gözəli, Klappın sevdiyi, Krım armudu, Bessemyanka, Bere-Dil, Vilyams, Küre, Duşes-Anqulem, Pass-Krassan, Jozefina, Dekanka, Tuluza, Bere-Qardi, Qış dekankası, Marqarita, Yaylıq Vilyams.

***Tətbiqyönümlü sortlar:*** Abasbəyi, Naxçıvan armudu, Yay armudu, Qizili, Nəbi, Payız armudu, Cəlali, Şəkəri, Şəkəri,Qırmızı şəkəri, Peyğənbəri, Qızıl armud, Yendicə armudu, Qış armudu, Əndəmic armudu.



**Şəkil 2. Yay armudu** **Şəkəri** **Abasbəyi**

## **Heyva** (*Cydonia* L)

Heyva Gülçiçəklilər fəsiləsinə, *Cydonia* L. cinsinə daxildir. (2n=34) monofiletik mənşəli ağac bitkisidir. Yalnız bir növü vardır. Adi heyva (*C.oblonga*L.). Bütün mədəni heyva sortları bu növdən yaranmışdır. Dünya miqyasında 250-dən çox, Azərbaycanda 46, Naxçıvan Muxtar Respublikasında heyvanın 14 sortu və 6 formasının yayıldığı aşkar edilmişdir. Muxtar respublkanin digər rayonlarında heyvanin Turş heyva, Sarı heyva, Qara heyva, Armudvari heyva , Sulu heyva, Nüseyni, Daş heyva sortları geniş əkilib-becərilir. Bunlardan da Turş heyva və Qara heyva mürəbbəlik üçün əvəz edilməzdir. Təzə halda yeyilməsi üçün Sarı heyva, Armudvari heyva və uzun müddət saxlanilmasi üçün isə Daş heyva, Hüseyini sortlarıni gostərmək olar. Onu da qeyd etmək lazımdır ki heyva sortları muxtar respublikamizin bütün torpaq tiplərində yuksək keyfiyyətli məhsul verir. Ərazidə Sarı heyva daha geniş yayılmışdır.



**Şəkil 3. Sarı heyva Peyğənbəri**



**Ordubadi**

***Heyva sortlarının genofondu:*** Ordubadi, Sarı Rəcəbi, Turş heyva sortları (3 sort), Zərdabi, Fədai, Ağca, Payızı küştü, Qızıl yubiley, Daş heyva. Fidan və s.

***Tətbiqyönümlü heyva sortları:*** Ordubadi, Sarı Rəcəbi, Əndəmic, Ordubadi, Sarı heyva, Nüseyni, Sulu heyva, Armudvari heyva , Qara heyva, Sarı Rəcəbi, Turş heyva. və s.

## **Əzgil** (*Mespilus)*

Əzgil gülçiçəyikimilər fəsiləsinə aiddir. Azərbaycanın dağ-meşə rayonlarında geniş yayılmışdır. Almayabənzər meyvələri olan əzgil (muşmula) ağacı Cənubi Qafqazda, eləcə də Krımda yayılmışdır. Yabanı halda yayılan əzgilin meyvələri sarı-qonur rəngdə olur, çox xırdadır, lətli hissəsi bərk, dadı turşməzədir. Lakin becərilən əzgilin meyvələri isə sarı rəngli olub, iridir və dadı şirindir.

***Əzgil növünün genofondu:***Naxçıvan Muxtar Respublikasının Batabat, Tilllək meşələrində bir yabanı mövü yayılmışdır.Bu növ həyətyanı sahələrdə tək-tək mədəni halda da becərilir. Introduksiya olunmiş adi əzgil növünə də həyətyanı sahələrdə rast gəlinir.

***Tətbiqyönümlü növ.*** Əzgili əsasən meyvəsinə görə becərdirlər. Mədəni növün meyvələri daha iri və ətli olması ilə fərqlənir..Əzgilin meyvəsini ağacdan dərib bir qədər saxladıqdan sonra yeyirlər. Yetişmiş yumşaq meyvəsinin tərkibində 10-16% şəkər və 1,2%, alma turşusu, qabığında isə karotin və C vitamini olur.. Qabığı və yarpaqları aşılayıcı maddələrlə zəngindir. Meyvəsi təzə halda yeyilir. Ondan cemlər, müxtəlif içkilər hazırlamaq üçün istifadə edilir.





**Şəkil 4. Adi əzgilin çiçəyi Yabanı əzgil**



**Becərilən əzgil biotipi**

## **Tut** ( *Morus alba*)

Tut *Moraceae* fəsiləsinə aiddir. Demək olar ki, bütün həyətyanı sahələrdə Bedanə ağ tut sortu geniş yayılmışdır. Melvələri həvəslə yeyilir. Bu sortun ağacları çox hündür olur. Naxçıvanda tut bitkisinin bir çox sortları yayılıbdır. Ərazidə Xar tut növü həyətyanı sahələrdə becərilir. Bu qiymətli bitki müxtar respublikanın əksər bolgələrində çox qədimdən becərilir. Ərazirə Danə-tyt, qara tut və s. sortları, toxumdan alınan şoxlu tut formaları yayılmışdır.

***Tut genofondu:*** Şah tut, Bidanə, Xar tut, Ağ tut, Qırmızı tut və *s.*

***Tətbiqyönümlü tut növ və sortları:*** Şah tut, Bidanə tut, Xar tut, Ağ tut, Adi tut.



**Şəkil 6. Ağ tut. Xar tut.**

**Əncir** (*Ficus carica)*

Ağ əncir (*Ficus carica)* tutkimilər fəsiləsinə daxildir. Onun əsas vətəni Suriya və Kiçik Asiya ölkələridir. Bundan başqa, əncir Aralıq dənizi sahillərində və xüsusən Yunanıstanda çox geniş yayılmışdır. Azərbaycanda da çoxlu növləri yayılmışdır.

***Bölgədə becərilən əncir sortları:***Ağ əncir, Sarı əncir, Qara əncir, Qəhvəyi əncir.

***Tətbiqyönümlü sortlar:*** Sarı əncir, Qara əncir, Qəhvəyi ənsir. Ordubadənciri.

*Çoxaldılması:* Muxtar respublika ərazisində əncir sortları əsasən kök pöhrələri vasitəsilə çoxaldılır. Payızda və ya erkən yazda əncir kollarının dibində əmələ gələn kök pöhrələri çıxarılaraq lazım olan yerlərə əkilir və çoxaldılır. Çox vaxt həyətyanı sahələrdə yeni zoğları əyərək üzəri torpaq qatı ilə örtülür. Payızda köklənmiş həmin kollar çıxarılaraq artırılır.

*Becərilməsi:*Münbit torpaqlara tələbkar bitki deyildir. Bütün növ torpaqlarda yaxşı inkişaf edir. Əncir bircinsli birevli bitkidir. Muxtar respublikada qış dövrü yerüstü hissəni şaxta apardıqda yeni əmələ gəlmiş zoğlarda ancaq dişi çiçəklər olur. Ona görə də tozlanma getmədiyindən birinci il məhsul vermir. Kolları şaxtadan qorunmuş birillik budaqlarda isə normal halda həm dişi, həm də erkək çiçəklər əmələ gəlir, tozlanma gedir, yüksək məhsul verir.





**Şəkil 7. Qəhvəyi əncir Sarı əncir**





**Ordubad ənciri Qara əncir**

**Adi nar (*Pinicagranatum)***

Adi nar *Punocaeae* fəsiləsi, nar (*Pinicagranatum*) cinsinə' aid olan bitki növüdür. Narın elmi adı iki latın sözünün birləşməsindən əmələ gəlmişdir. *Pinica*- tünd qırmızı və ya parlaq qırmızı, *qranatus* – isə dənə deməkdir.

***Bölgədə becərilən nar növü və sortları:*** Naxçıvan MR-də yabanı halda Ordubad bölgəsinin Arazboyu ərazilərində yayılmışdir. Bu yabanı növü qış fəslində şaxta aparmır. Ordubad rayonu ərazisində bu yabanı növ həyətyanı sahələrdə də becərilir. Hazırda bölgədə Azərbaycanın digər ərazilərdən də introduksiya olunmuş nar sortlarına rast gəlinir.

***Tətbiqyönümlü növ və sortların becərilməsi:*** Ordubad ərazisində uzun illərdir yabanı nar növü mədəni şəraitdə becərilməklə bir neçə biotipi yaradılmışdır. Belə formalardan ən geniş yayılanı Ordubad rayonunda həyətyanı sahələrdə yabanı narın iki biotipi yayılmışdır.

Naxcçvan MR bölgəsi kəskin kontinental iqlim tipinə malik olduğuna görə ərazidə qış fəslində $15^0$ C-dən aşağı temperaturda nar kollarını şaxta aparır. Ona görə də həyətyanı sahələrdə becərilən sortların üzəri qış fəslində polietilen örtüklərlə sarınaraq qorunub saxlanılır.





**Şəkil 8. Ordubad narı biotipi-1 Ordubad narı biotipi- 2**





**Yabanı nar**

**Yemişan (Genus*Crataegus*L.)**

***Genofondu****:* Qanqırmızı yemişan, Qafqaz yemişanı, Tükcüklüçiçək yemişan, Pallas yemişanı, Meyer yemişanı, Pallas yemişanı. Müxtəlifyarpaq yemişan, Yalançı-müxtəlifyarpaq yemişan, Yalançı-müxtəlifyarpaq yemişan, Zəngəzur yemişanı, Biryuvalı yemişan, Beşyuvalı yemişan, Çinovski yemişanı, Şərq yemişanı, Pojarkov yemişanı , Pont yemişanıŞoviç yemişanı Turnefor yemişanı.

*Iqtisadi əhəmiyyətli növlər:* Naxçıvan biryuvalı yemişanı, Beşyuvalı yemişan. Şərq yemişanı.



**Şəkil 8. Beşyuvalı yemişan Şərq yemişanı Naxçıvan sarı yemişanı**

## Sitrus meyvələri

### Limon

***Limon sortları:*** Ordubad limonu, Sultanı, Əndəmic limonu, Nazik qabıq limon, qalın qabıq limon və s.

***Tətbiqyövümlü sortlar:*** Ordubad limonu, Əndəmic limonu, Nazik qabıq limon.

Limon çox faydalı bitkidir. Azərbaycanın subtropik rayonlarında (Lənkəran, Astara və s.) son illərdə müvəffəqiyyətlə becərilir və onun əkin sahələri ildən-ilə genişləndirilir. Limonun vətəni qədim Hindistan torpağıdır. Əfsanəvi hindli tayfaları onu sağlamlığın qorunmasında universal bir vasitə sayırlar. Hər adam özünü gündə bir limon yeməyə və bir limonun şirəsini içməyə öyrətməlidir. Guman edilir ki, "limon" sözü malay dilində bu meyvəni adlandıran "lerno" sozündən əmələ gəlmişdir. Çində isə bu bitkini "limunq" adlandırırlar və tərcümədə bu "analar üçün xeyirli" deməkdir. Bütün başqa sitruslar kimi, limonun iç hissəsi qalın qabıqla örtülür, ətli hissə isə nazik ağ pərdə ilə bağlanmış dilimlərə bölünür. Lətin ortası dadsız ağ maddədən ibarətdir. Limon ağacının meyvələrindən istifadə olunur.

***İqtisadi əhəmiyyəti:*** Naxçıvan MR Ordubad rayonu ərazisində istixana şəraitində hər bir normal inkişaf etmiş limon ağacından 10-15 kq, bəzən daha çox məhsul əldə olunur. Hər ağacdan 25-30 ədəd limon əldə olunsa bir ağacdan 250-300 m. pul gəliri əldə olunar.





**Şəkil 5. Qalınqabıq limon** **Nazik qabıq limon**





**Ordubad limonu**

## Çəyirdəkli Meyvələr

### Gilas və Gilənar

Muxtar respublika ərazisində 12 (5 yerli, 7 introduksiya edilmiş), gilənarın 7 (4 yerli, 3 introduksiya edilmiş) sortunun olduğu müəyyənləşdirilmişdir. Bölgədəki gilas və gilənar sortları bir-birindən gövdə quruluşuna, yetişmə müddətinə, biokimyəvi tərkibinə, meyvələrinin rənginə, dadına və s. genetik əlamətlərunə görə fərqlənirlər.

***Gilas genofondu:*** Ordubad gilası, Şampan gilas, Zeynəddin gilası, Anadolu, Qırmızı növrəst, Məzrə, Şirin qara, Öküzürəyi, Sarı ğilas, Ağ gilas, Acı qara, Şirin qara, Sarı gilas, May gilası, və s.

***Gilanar genofondu:*** Cır gilənar, Külüs gilənarı, Ordubad gilənarı, Dırnıs gilənarı, Naxçıvan gilənarı, Qırmızı növrəst, Qara,gilənar, Şirin gilənar və s.

***Tətbiqyönümlü sortlar:*** Ordubad gilası, Zeynəddin gilası, Anadolu, Qırmızı növrəst, Məzrə, Şirin qara, Öküzürəyi, Acı qara, Sarı gilas, May gilası Külüs gilənarı, Külüs gilənarı, Ordubad gilənarı, Dırnıs gilənarı.





**Şəkil 9. Çəhrayı gilas** **Naxçıvan gilanarı**



**Şanpan gilənarı**
(başlanğıc sortla müqaisəli şəkli).

### Gavalı

Muxtar respublika ərazisində gavalının aşağıdakı sortları yayılmışdır:

***Albuxara (Gavalı) genofondu:*** Vəzir alı, Gülaman, Sarı alı, Naxçıvan albuxarası, Armudvari gavalı, Nəsimi albuxarası, Ordubad albuxarası, Araz albuxarası, Qara albuxara, Sarı albuxara, Növrəst albuxara, Xatını,Yapon alı Qızıldamcı və s..

***Tətbiqyönümlü sortlar:*** Vəzir alı, Sarı alı, Naxçıvan albuxarası, Ordubad albuxarası, Qara albuxara, Sarı albuxara, Növrəst albuxara, Qara alı, Vəzir alı, Qızıldamcı, Yapon alısı.





**Şəkil 10.Qırmızı almaxara** **Vəzir alı**





**Çəhrayi almaxara** **Qara almaxara**

## Zoğal (*Cornus*)

Zoğal zoğalkimilər fəsiləsinə aiddir. Zoğal Böyük və Kiçik Qafqaz dağlarının ətəklərindəki meşəliklərdə yabanı halda yayılmışdır.

***Muxtar respublika ərazisində yayılan sortu:*** Ordubad zoğalı.

***Tətbiyönümlü sort:*** Ordubad zoğalı.

*Sənayedə istifadəsi və əhəmiyyəti:* Qida və müalicəvi əhəmiyyəti vardır. Sənaye miqyasında və ev şəraitində zoğal mürəbbələrinin hazırlanmasında geniş şəkildə istifadə olunur.



**Şəkil 11. Ordubad zoğalı**

## Alça ( *Prunus*Mill.)

Naxçıvan MR-də yayılan Ev alçası (*Prunusdo-mestica* L.) növü daha çox iqtisadi əhəmiyyətlidir.

***Alça genofondu:*** Ərazidə Ev alçası növünün Ağ alça, Qırmızı alça, Təbərzə, Sarı alça, Payız alçası, Şabranı, Ağaca, Turş alça, Yay mələzi, Payız mələzi, Gülaman alça, Mələyi, Mərəz alça, Naxçıvan göycəsi, Yaz mələsi, Gülaman alça, Təbərzə, Payız alçası, Şabranı, Ağaca və s. sortları vardır.

***Tətbiqyönümlü sortlar:*** Naxçıvan göycəsi, Ağ alça, Qırmızı alça, Təbərzə, Sarı alça, Payız alçası, Yay mələzi, Payız mələzi, Mələyi, Mərəz alça, Yaz mələsi, Təbərzə, Payız alçası.



**Şəkil 12. Naxçıvan göycəsi Payız alçası Qırmızı alça S**





**Arı alça Göyəm**

## Göyəm (*Prunus spinosa*)

Göyəm gülçiçəklilər fəsiləsinin gavalı cinsinə aiddür. Muxtar respublika ərazisində həyətyanı sahələrdə becərili. Meyvələri daha çox təzə halda istifadə olunur. Tam yetişmiş meyvələrindən qurudulmuş məhsul istehsalında da istifadə olunur.

***Göyəm sortları:***Adi göyəm, Xangöyəm.

***Tədbiqyönümlü sortları:*** Xangöyəm və müxtəlif biotipləri.

## Ərik (*Armeniaca* Mill.)

Ərik *Rosaceae* Adans. - Gülçiçəklikimilər fəsiləsinin *Armeniaca* Mill. cinsinə daxildir. Ərik çəyirdəkli meyvə bitkiləri içərisində özünəməxsus bir yer tutur. Naxçıvan MR-də ərik növünün aşağıdakı genofondu mövcutdur:

***Ərik genofondu:***Ağ növrəsti, Sarı növrəsti, Qırmızı növrəsti, Naxçıvani, Abutalibi, Ordubadi, Şalax, Haqverdi, Təbərzə, Ağ ərik, Ağ təbərzə, Ağcanabad, Göyçənəbad, Balyarım, Xosrovşahi, Abutalibi, Təbərzə, Şalax, Ağ ərik, Alyanaq, Ağ növrəst, Limon ərik, Balyarımı, Badamı, Haqverdi, Badam ərik Toxum Şəmsi, Ağai, Həsən bəyi, Kababi, Cır ərik və s.

***Tətbiqyönümlü ərik sortları:*** Növrəsti, Ağ ərik, Abutalibi, Şalax, Ağ ərik, Badamı ərik, Limonlu ərik.



**Şəkil 13. Şalax ərik Badam ərik**



**Limon ərik Ağcanabad Ağ ərik**

## Şaftalı

Muxtar respublika ərazisində Arazboyu düzənlik ərazilərdə geniş yayılmışdır. Çoxlu sayda toxumdan alınan müxtəlif irsi xüsusiyyətlərə malik olan formaları vardır.

***Şaftalı genofondu:*** Salami, Zəfərani, Mayçiçəyi, Ağ nazlı, Qırmızı nazlı, Payızı hülü, Zərdabi, Fədai, Ağca, Payızı küştü, Tərəlli, Şərəlli, Qızıl yubiley, Fidan və s.

***Tətbiqyönümlü sortlar:*** Salami, Zəfərani, Mayçiçəyi, Ağ nazlı, Qırmızı nazlı,Payızı hülü, Zərdabi, Fədai, Ağca, Payızı küştü, Tərəlli, Şərəlli.



**Şəkil 14. Salami ZəfəraniTərəlli**





**Əncirvari şaftalı**

## Qoz meyvələr

**Qoz** (*Juglans*)

Qoz və ya Cəviz qozkimilər fəsiləsinə aiddir. Bu cinsin yer kürəsində 40-a qədər müxtəlif növü vardır. Yunan (*J. regia* L.) qozu növünün 1000-dən çox forma müxtəlifliyi vardır ki, onlardan 300-400 forma yüksək keyfiyyət göstəricilərinə malikdir. Azərbaycanda 2 növü. *J. regia* L. və *J. nigra* L. yetişdirilir. Naxçıvan Muxtar Respublikasında isə *J. regia* L., *J. nigra*L. və *J. sericea* L. növlərinə təsadüf edilir. Respublikanın hər yerində *J. regia* L. növü əkilib becərilir və hətta yabanılaşmış bitkilərə də rast gəlinir. Qara və boz qoz isə bölgəyə intraduksiya edilmişdir.

***Qoz sortları:*** *Kağızı, Çətənə, Seyfi, Suğra, Araz, Disar, Vənənd və s.*

***Tətbiqyönümlü qoz sortları:*** Yunan *(J. regia L.)* qozu növünün Kağızı, Çətənə, Vənənd. və s. sortları



**Şəkil 15. Çətənə qoz Kağızı qoz**



**Qoz meyvəsi**

## Püstə *(Elaegnaceae)*

Püstə *Elaegnaceae* fəsiləsinə aiddir. Sinonimi *Terebinthus*Mill-dir.Naxçıvan MR-də yabanı halda bi növünə rast gəlinir. Həyətyanı sahələrdə də tək-tək becərilir. AMEA Naxçıvan Bölməsi Bioresurslar İnstitunun Nəbatat başında qorunub saxlanılır. Aşacları orta irilikdədir. Qabığı ağımtıl rənglidir. Qətranlı ağacdır. Yarpaqları qalınlaşmış şəkildədir. Üzəri parlaqdır. Çiçəkləri yarpaqın qoltuğunda yerləşir. Meyvələri salxımçəkillisaplaqın üzərində yerləşir, yaşımtıl-bənövşəyi rənglidir. Qartan və aşı maddələri ilə zəngindir. Naxçıvan MR-də may ayında çiçəkləyir. Meyvələri sentyabr ayında yetişir. Mümbit torpağa tələbkardır. Quraqlığa dözümlüdür.

*Çoxaldılması:* Əsasən toxumla çoxaldılır Calaq-etmə ilə də artırılır. Calaq işini payızın axırında şirə axını tam dayandıqda, yaxud qışın sonunda, yazın əvvəlində aparmaq lazımdır.




**Şəkil 16. Yabanı püstə kolu Püstə meyvəsi**

## Badam (*Amygdalus L.*)

Badam gülçiçəklilər fəsiləsinə daxildir. Dünya-da badam cinsinin 40 növə qədər ağac və kolu məlumdur. Azərbaycanda 4 növü yayılmışdır. Badam yabanı halda Orta Asiyada, Dağıstanda, Azərbaycanda bitir. Naxçıvan Muxtar Respublika-sının dağlıq hissələrində yabanı badamlıqlar böyük sahələriəhatə edir. Ordubad, Şahbuz Culfa rayonlarının dağlıq ərazilərində yabanı badam geniş yayılmışdır. Düzən və dağətəyi ərazilərdə mədəni badam sortları şeniş yayılmışdır. Qeyd etmək lazımdır ki, mədəni badam sortları yabanı badama çox yaxındır və ancaq meyvələrinin böyüklüyü, qabıqlarının nazikliyi ilə fərqlənirlər.

***Yabanı nönlər:***Naxçıvan (Zair) badam, Ordubad (Fenzil) badam.

***Yayılan sortlar:*** Kətan köynək, Qoşaləpə, Daş badam,Şirin badam, Süsəni.toxumdan alınan çoxlu yeni formalar.

***Tətbiqtönümlü sortlar:*** Şirin badam, Kətan köynək, Qoşaləpə.



**Şəkil 17. Ordubad badanı Kətan köynək**



**Daş badam**



**Qoşaləpə**

## Naxçıvan MR-in landşaft xüsusiyyətləri üzrə meyvəçiliyin əsas hündürlük qurşaqlarında becərildiyi ərazilər

Naxçıvan MR ərazsinin landşaftı tipoloji xüsusiy-yətini nəzərə alaraq S.Babayevlə, B.Budaqov birgə burada üç əsas təbii rayon ayırmışlar. Müxtəlif meyvə növ və sortlarınının bu bölgələr üzrə yayılması aşağıda qeyd edilmişdir:

1. *Şərur-Ordubad maili- düzənlik əraziləri.* Bu ərazidə yaylıq alma sortları, armud, heyva, şaftalı, hülü, əncir, limon, alca, Naxçıvan göycəsi, Qoz, fındıq, badam və s. meyvə sortları becərilməsi iqtiisadi baxımdan çox əhəmiyyətlidir;
2. *Dağətəyi və orta dağlıq ərazilər.* Bu ərazidə əsasən payızlıq və qışlıq alma sortları, payız armudu, alca, qoz, yemişan, əzgil sortlarının becərilməsi iqtiisadi əhəmiyyətə malikdir;
3. *Yüksək dağlıqvə dağ çəmənlikərazilsi.* Bu ərazidə payızlıq və qışlıq alma sortları, payız armudu

sortları, dağ alcası və qoz, yemişan, əzgil sortlarının becərilməsi iqtisadi əhəmiyyət kəsb edir.

Beləliklə, qeyd etmək lazımdır ki, aqrar sektorun bu vacib və iqtisadi cəhətdən səmərəli sahələrinin inkişaf etdirilməsi əhalinin yerli kənd təsərrüfatı məhsullarına olan tələbatının ödənilməsində əhəmiyyətli rol oynayır. Qeyd etmək istərdik ki, muxtar respublikada meyvəçiliyin inkişaf etdirilməsi ilə bağlı qəbul edilmiş hər iki dövlət proqramı çox böyük mahiyyət kəsb edir. İlk növbədə, bu Dövlət proqramları muxtar respublikanın özünəməxsus və bölgə üçün xas olan kənd təsərrüfatı məhsullarının yetişdirilməsinə, təsərrüfatçılıq ənənələrinin yaşadılmasına və təbliğinə şərait yaradır. Digər tərəfdən yerli məhsulların istehsalının artırılması məşğulluq məsələlərinin həllinə və əhalinin ekoloji təmiz təbii meyvə məhsulları ilə təminatına töhfə verər. Bu da əhalinin ərzaq təhlükəsizliyinin təmin olunması ilə yanaşı, həm də sağlam həyatımıza qoyulan investisiya kimi düşünülməlidir. Yerli meyvə məhsullarının istehsalının artırılması muxtar respublikanın turizm potensialında önəmli rol oynaya bilər. Çünki, aparıcı turizm şirkətlərinin araşdırmalarına görə günəşli ölkələrə səfər edən əcnəbi turistlərin (əsasən şimal ölkələrin vətəndaşları) əksəriyyətinin gündəlik qida normasında bu cür kənd təsərrüfatı məhsulları xüsusi paya malikdir. Belə qida normasına təbii meyvə şirələrindən tutmuş onlardan hazırlanan müxtəlif salat və yemək növlərinədək çox məhsul daxildir. Hətta, bəzi ölkələr bu sahədə daha da irəli gedərək turistlər üçün müxtəlif mağaza və restoranların açılmasınadək sektorda mühüm nailiyyətlər əldə etməyi bacarıblar. Ona görə də muxtar respublikada meyvəçiliyin inkişaf etdirilməsi strateji əhəmiyyət daşıyır.

## ƏDƏBİYYAT

**1.** 2008-2015-ci illərdə Naxçıvan Muxtar Respublikasında əhalinin ərzaq məhsulları ilə etibarlı təminatına dair Dövlət Proqramı. Naxçıvan: "Şərq qapısı" qəzeti, № 182, 18 sentyabr 2008-cü il. **2.** Beşinci çağırış Naxçıvan Muxtar Respublikası Ali Məclisinin ikinci sessiyasında Naxçıvan Muxtar Respublikası Ali Məclisinin Sədri Vasif Talıbovun məruzəsi. Naxçıvan: "Şərq qapısı " qəzeti, 22 dekabr 2015-ci il. **3.** Beşinci çağırış Naxçıvan Muxtar Respublikası Ali Məclisinin üçüncü sessiyasında Naxçıvan Muxtar Respublikası Ali Məclisinin Sədri Vasif Talıbovun məruzəsi. Naxçıvan: "Şərq qapısı " qəzeti,22 İyul 2016-cı il. **4.** Doqquzuncu çağırış Naxçıvan Muxtar Respublikası Ali Məclisinin onuncu sesiyasında Naxçıvan Muxtar Respublikası Ali Məclisinin Sədri Vasif Talıbovun məruzəsi. Naxçıvan: "Şərq qapısı " qəzeti, № 249. 28 dekabr 2014-cü il. **5.** Tariyel Talıbov, Sədaqət Babayeva. Ərik. Bakı: Elm, 1997, 92 s. **6.** Orxan Bağırov, Tariyel Talıbov. Naxçıvan Muxtar Respublikasının gilas və albalı genofondu. Bakı: Elm və təhsil, 2016, 179 s. **7.** Tariyel Talıbov, Loğman Bayramov. Naxçıvan Muxtar Respublikasında alma genofondu. Bakı: Afpoliqraf, 2013, 156 s. **8.** Varis Quliyev. Naxçivan göycəsi sortunun bioloji xüsusiyyətləri. AMEA Naxçıvan Bölməsi, Xəbərlər, Naxçıvan: Tusi, 2016 № 4, 92-99 s. **9.** Varis Quliyev. Naxçivan Muxtar Respublikasinda alça növünün biomüxtəlifliyi və genetik xüsusiyyətləri.AMEA Naxçıvan Bölməsi // Xəbərlər, Naxçıvan: Tusi, 2017, № 4, 102-110 s.

### Сортовой состав генофонда плодов Нахычиванской Автономной Республики

**В.М. Кулиев**

В статье дано состав генофонда плодов выращиваемых в Нахчыванской Автономной Республике, исследованы сортовые разнообразия косточковых, семечковых, орехоплодных культур выращиваемых на данной территории. А также в статье определены производственно применяемые, экономически эффективные сорта, даны информации об основных зонах естественного распространения плодовых сортов по ландшафтным особенностям территории Нахчыванской АР.

***Ключевые слова:*** плодоводство, косточковые культуры, семечковые культуры, орехоплодные культуры, ландшафт, сорт.

### The variety content of fruits genofund of Nakhchivan Autonomous Republic

**V.M. Guliyev**

In article there is given the composition of the gene pool of fruits grown in the Nakhchivan Autonomous Republic, examined variety varieties of stone fruit, seed fruit, nut bearing crops growing in this area. And also in the article are defined, applied production, cost-effective varieties, information on the main zones of natural spread of fruit varieties according to the landscape features of the territory of the Nakhchivan Autonomous Republic.

***Key words*:** orcharding, stone fruit, seed fruit, nut bearing crops, landscape, variety.

***Bu iş Azərbaycan Respublikası Prezidenti yanında Elmin İnkişafı Fondunun maliyyə dəstəyi ilə yerinə yetirilmişdir- Qrant №EİF- KETPL-2_2015-1(25)-56/39/3***

*E-mail: varisquliyev@mail.ru*